# Molla Nəsrəddin



# ملّا نصرالدّین

E-kitab halına saldı: Cavid Ağa

Yekşənbə, 1 şaban 1339 **On altımcı il** 21 həməl 1300

ملّانصرالدّين

MOLLA NƏSRƏDDİN

Şümarə 5 *Qiyməti satıcı əlində on altı şahı* №5









*Abunə qiyməti:* *Hər həftə nəşr olunur* *Məhəlli-idarə:*

| | |
|---|---|
| İlliyi | 40 qran |
| Yarım illiyi | 22 qran |
| Üç aylığı | 12 qran |
| Tək nüsxəsi satıcı əlində | 16 şahı |
| Əcnəbi məmləkətlərdə illiyi | 60 qran |

Təbriz, bazari usta şagird, xanəyi—şahzadə Nüsrətüssəltənə

Teleqraf və post ünvanı: Təbriz, "Molla Nəsrəddin"

## MƏKTUBE-AĞAYE-RƏİSE-POST

Xedməte ağaye modire möhtərəme cərideye "Molla Nəsrəddin" damə bəqaə!

Xaheşməndəm movafeqe qanune mətbuat in moxtəsərra dər teyye şümareye pəncome cəride dər səfheye əvvəl dərc fərmayid.

Dər şomareye (4) bemoştərəkine cəride elləte ədəme vosule şomareye (l) və (2) ra binəzmiye postxane əşar fərmude və əz an yəse vətənpərəstan ra nətice gerefteid. Həqiqətən caye təəssof və təhəyyor əst. Ba inke cəhətra cənabali betoroğe moxtəlife mottəle budid, aya behtər nəbud qəblən əz edareye post şefahən və ya kətbən sual mifərmudid? Dər surətike cəvabe qanekonənde nemişenidid anvəqt pərtabkərdəne hərbeye ettiham bebədəne zəife post səhl bud. Bəli, cərideye "Molla Nəsrəd din" dər bədove nəşre an bevaseteye elləte xareci betəvəssote post ersal məqsəd nəgərdid.

Likən pəs əz rəfe ozr ançe be postxane dade şode be məqsəd ferestade şod. Dər in surət hər kodam əz nomərate cəride beməqsəd nəreside esm və məhəlle girənde ra ettela bedəhid ta edareye post dər moqabele məsuliyyəti ke darəd əz ohde bərayəd. Əmma dər xosuse ədəme nəzme postxane və yəsevətənpərəstan ettelaən ərz mikonəm ke, bənde xub xəbər darəm ke, bamoucebat və moğtəziyyate emruziye məmləkəte lran edareye post be təsdiqe xarec və daxel və dust və doşmən monəzzəm əst. Və vətənpərəstan niz hənuz əz təsisate an məyus nəşodeənd. Dər xateme xaheşməndəm pəs əz dərce in məktub dər şomareye pəncome cəride dər zeyle an əz edareye post tərziye hasel konid.

Rəise əyalətiye poste Azərbaycan: Mobəşşerussəltəne

## BİR SUAL

Ay Molla əmi, təvəqqe' edirəm ki, yazasan görək bu nə işdi: Cənıadiüs-saninin on doqquzundakı binagüzarlığın bir maddəsi bizim məktəbimizdə kamilən mücri olunur, yə'ni müəllimlər hamısı demokrasi üsul ilə hüquq aparırlar. Bizim məktəbdə yeddi klas var, on müəllim...

Allah bərəkət versin, hərəsi bir fəndə səramədi-əsrdirlər. Birisi riyazidən "Araqo"nun əlini taxta bağlayır, o birisi şairi-bibak "Dabanı çattax xala" onun əlinə su tökə bilməz. Birisi flan.... birisi.... flan... nə başın ağrıdım: bir məcməi-ürfan. Molla əmi, indi söz burasındadır ki, bu müəllimlər klasa girəndə dilləri tutulur, götürək istəyir fizık deməyə, kıtabın üzunü oxuya bilmir, istəyir daskada şagirdlərə şəkil göstərsin əl-ayağı titrəyir. Ay Molla əmi, millətin də ümid gözü mədrəsələrə baxır. İndi de görək bizim çarəmiz nədir...

Ay Molla əmi, əl mənim ətək sənin, mənə bir cavab.

*Oxucu*

## İDARƏDƏN:

Çarəsi ittihadi-müəllimin, genə ittihadi-müəllimin.

## HAMAMLARIMIZ

Xoruzlar bannadı, burğu çalındı, vəqti-hacətdir
Açıldı babi-gərmabə qulaq ver buye-gəndabə
Mürəkkəbdir nəcisidən tarü pudi abi hammamun
Sudur bu gördüyüm şey xəznədə, ya xilti-ahəkdir
Təbiət sahibi burnun tutar buyi-kəsafətdən,
Zi bəs ki, qıl firavandır, tənində ip toxur bitlər...
Üzündə bir qarış qalınlığında rovqəni dünbə,
Səhihü nasəlamət, nikü bəd, sevdalı sevdasız,
Keçəllər başini yağlar, girəndə xəznəyə ağlar
Gözün qırpar, əgər qaşun, iki əlli qaşar başun,
Hamamı səhldir (xındı keçəl) murdar edər kürri...
Girəndə xəznəyə bihal olur islıal olan naxoş,
Provla ağzuvu, vaiz deyir, qüsl eyləyən dəmdə.
Bu nə sözdür deyirsən, bəndəgane həqqə, ey vaiz?
Beş on gün ömri var, ya yox, imarət saldırır haci,
Məbaliğ xərc edər dövlətlilər bihudə yerlərdə,
Çayın pis yaxçısından anlayır hacı, əcəbdir bu,
Hamamın pisliyindəndir keçəllik bu vilayətdə...
Qızı oğlanı məhbub eyləyən zülfi-müsəlsəldir
Hələ əski qafa çoxdur Güney mülkündə, ey şair,

Gozün aç dilbərim, itlər hürür, gör nə qiyamətdir.
Demə vəqt olmayıb hala, bu pis iy bir əlamətdir?
Bu söz böhtandı haşa çirk şəhvətdən ibarətdir?
Həcamət qanıdır bu, ey Xuda, ya xuni-adətdir?
Əsər yoxdur nəzafətdən, əcəb cayi-təharətdir...
Əgər almaq xəyalın var buyur gəl, nırxi babətdir.
Rəvayət eyləyir ravi, içi yeksər kəsafətdir...
Hamı bir yerdə yığılsın, yuvunsun gör nə halətdir?
Sıcaq su başini dağlar. Neçün? Çünki cərahətdir...
Tökər həmmamə göz yaşin.., keçəllərdə bu adətdir.
Soxulma yanına, keç get, əgər başun səlamətdir...
Bu söz şərh istəməz huşyara, bir ima kifayətdir...
Məzacun çəkməsə qus, qusmasan eyni-səadətdir.
Məgər abi-pəlidi ağza doldurınaq zərafətdir?
Ki keyf çəksin flan baci, flan varis, həmaqətdir.
Nəzafət barəsində pullular əhli-qənaətdir.
Çimir poxlu suda heç anlamır bu nə fərasətdir.
Səbəb bu illətə zənn etmə ifrati-hərarətdir...
Bu ne'mətdən səri məhrum olan daim xəcalətdir...
Özün bıhudə yorma, qardaş, əyyami-cəhalətdir.

# GÜŞVARƏ

Molla əmi, yalan deyənin atasına, babasına, yetmiş iki arxasına, Yezidə lənət. Bir gün getdim məşhur Hacı Musa xan hamamına, xəznəyə girəndə gördüm ki, ağayi Hac.. .mülk ağa da hamamdadı. Bir ovuc su o mənə təarüf elədi, bir ovuc su da mən o cənaba tərəf səpdim. Birdən ikimizin də gözümüz ilişdi suyun üzündə bir sarı zada. Mən dedim Hac.. .mülk ağa, o nədi? O da bir az baxdı birdən hücum elədi o sarı zadın tərəfinə ki; ay qızıl güşvarə, qızıl güşvarə. Mən mat qaldım ki, bəs deyirlər ki, qızıl hər zaddan ağır olar, necə qızıl güşvarə suyun dibinə batmayıb, üzünə qalxıb? Genə də öz-özümə dedim ki, mənim kimi kəntdilər nə bilir. Genə də bu cür Hac.. .mülk ağalar bilər.... Elə onda gördünı ki, Hac.. mülk ağa əlin o sarı zada vuran kimi o zad dağıldı. Ağa da "püff" deyib, burnun tutub yaman deyə-deyə qayıtdı qaçdı...!!!

*Utanmaz kətdi*

# İLAN-QURBAĞA

Dünən postdan bir məktub aldım, yazılıb ki, "İdarədən xahiş edirəm Rasta küçəyə mənim adıma altı aylıq ruznamə göndərilsin".

Məktubun axırında imza əvəzinə bir qurbağa şəkli çəkilib.

Dedim bəlkə məktub sahibi mənnən zarafat eləyirmiş.

İki gündən sora məktub sahibi gəldi idarəyə və ruznamənin təxirindən başladı giley eləməyə. Mən məktubu göstərdim və qurbağanı nişan verdim və zarafatın səbəbini soruşdunı. Ağa bir az rəncidə olan kimi, cavab verdi ki:

-O qurbağa deyil, imzamdır.

Gündə idarəmizə beş-on məktub gəlir, Allaha and olsun ki, bir dəfə də olmayıb ki, məktub sahibinin adını oxuya biləm; çünki imza əvəzində bu nainsafların biri ilan şəkli çəkib, biri quş şəkli çəkib, biri aeroplan çəkib.

Xülasə, dünyada bir ilan-çayan yoxdur ki, məktublarda imza əvəzinə çəkilməsin və indi bu saət idarəmizdə on beş, iyirmi abunə sifarişi biəncam qalıb; çünki abunə istəyənlərin adlarını hər kəsə nişan veririk, oxuya bilmir.

Dostlarımın çoxu mənim gözümün qabağında bir kəsə kağız yazıb qurtaranda mən onun hərəkətinə tamaşa edirəm; o yerə ki, istəyir adını yazsın, qabaqca qələmini tez-tez davata mizləyib kağızı bir az yanqılıcı tutur. Sora başını bir az əyir aşağı və hıqqana-hıqqana adının baş hərfini yazır və sora həmin hərfin ətrafına hörümçək toru kimi bir çoxlu cızmaqara çəkir.

Deyirəm:

-Bu nədir?

Deyir:

-Mənim imzamdır.

Deyirəm:

Bəs niyə ismi-şərifinizi yazmırsınız ki, kağızı oxuyan bilsin?

Deyir:

-Bu mənim adımdır.

-Deyirəm bağışla, bilmədim.

Belə tutaq ki, mən böhtan deyirəm, indi and verirəm oxucuları Xoyda rəiyyət evlərində qonaq qalan və İsmayıl ağa müharibəsində qeyrət göstərən bə'zi atlıların insafına, heç bir dəfə ittifaq düşübdümü ki, İranda yazılan məktubları alanlar məktubun imzasını oxuya bilsinlər? Ancaq zənn ilə və möhr olsa möhr ilə, yainki poçt əlaməti vasitəsilə təxminən bilirlər ki, məktub sahibi kimdir.

İmzaların çoxu ilan şəklindədir. Bə'zisi milçək, qarışqa, soxulcan və dozanqurdu şəklində olur.



Çoxusu cızma-qaradır, bır parası bir neçə cızıqdan ibarətdir. Bə’zi də adının baş hərflni yazan kimi, hərfln ətrafını cızıqlayır və ətrafına balaca-balaca quş qanadı düzür.

Budur bızim imzalarımız. Danışanda özümüzə bərabər yer üzündə bir ayrı qələm sahibi bilmirik, amma mənə qalırsa, bu imzalarımıza baxanda gərək mərd-mərdanə boynumuza alaq ki, yer üzündə əgər bir biməna və gülüncə layiq olan millət varsa, o da həmin başıboş ağalardır ki, anaları qoyduqları adı yazmağa guya utanıb, ilan-qurbağa çəkirlər ki, bədbəxt kağızı oxuyan bilməsin ki, kağızı yazan kimdir.

Biçarə millət.

*Mozalan*



**CA QƏSBİ**

Bir gün bir dəlidən soruşdular ki, "ca qəsbi, camə qəsbi" ibarələrini məna eləsin. Dəli bir qədər fikrə gedəndən sora belə cavab verdi:

"Ca qəsbi" haman ali imarətə deyirlər ki, ibarət ola dörd beş həyətdən: həyəti-birun, həyəti-əndərun, həyəti-xəlvət, həyəti-ziyafət. Talar talar içində, havuz, gülkarlıq, tovlə, aşbazxana, ambarlar, zirzəmilər, buzxanası, çayxanası, tiryəkxanası. Və bu ali imarətdə əyləşən bir nəfər adam və beş altı baş ailəsi və beş altı nəfər nökəri (söz yox, xədimi də olacaq). Digər tərəfdən də biçizlərin iyirmi otuz nəfəri tıxnaşa bir qaranlıq rütubətli evə, hələ bəlkə çoxları yağış və qar altında zindəganlıq eləyərlər, yainki mədrəsələrə yer tapılmaya və müftə müəllimlər yüz nəfər keçəl küçəl şagirdi qata bir qaranlıq tövləyə və orada dərs deyə. Buna deyərlər "ca qəsbi"; yə’ni qabaqkı ali imarətdə namaz da batildir, hələ bəlkə çörək yemək də sahibinə haram yazılacaq.



"Camə qəsbi" də budur ki, bir dövlətli şəxsin on dörd dəst köhnəlmiş paltarı evdə boxçada ola ola gedə dərziyə, genə paltar tikdirə; amma həmin ağanı əmndə saxlamaq üçün İsmayıl ağa tə’dibi üçün gedən qoşunlar dağda daşda qışın şiddətli soyuğunda titrəyə titrəyə sərhəddi müdafiə elə yələr, küçələrdə də yetim uşaqlar lüt sərgərdan dolana dolana düşüb ölələr.

Buna da deyər "camə qəsbi", yəni belə paltarda namaz qılmaq nə Allaha xoş gələr, nə də vicdanlı bəndəyə xoş gələr.



Pəh, pəh, pəh! Bu da, maşaallah, söz danışdı.

A kişi, vurun peysərindən dəli oğlu dəlini, cəhənnəm olsun qoysun getsin. Gör nə günə qalmışıq ki, dəlilər də gəlib bizə məsələ öyrədir.

*İmza: Dəli*



**LÜĞƏT**

ƏDLİYYƏ - Ədl, yə’ni tay ki, ikisi bir yük olur, yəni buraya rüşvət gərək tay-tay gələ. Əgər yük-yük gəlsə həmi qapıdan keçməz, həmi görərlər.

DOSİYƏ - Yə’ni iki siyə ki, bir çərək olsun ə’zanın cibinin ağzı və genliyi. Bu da qədim ucuzluq zamanında idi. İndi (arşiv) deyirlər, yə’ni bir arşın gərək olsun.

MÜSTƏNTİQ - Yə’ni üstən elə sal cibimə ki, tıqqıldasın və tıqqıltısın eşidim.

İSTENAF - Bu kəlmə təzələmək mə’nasındadır. Yə’ni indiyə kimi hər nə vermisən heç, əgər istəyirsən ki, işüvə baxılsın təzədən və əvvəlkindən çox.

CƏLBİ-ŞƏXSl-SALİS - Yə’ni tərəfinin pulu qurtarmağa yaxın bir üçüncü şəxs hökmən tapmalı.

KƏFİL (fil kimi) - Yəni müddə və müddəiəleyhi soyub cücəyə döndərəndən sora bir ayrı fil kimi bir adam tapıb bu işə qarışdırmalı.

TƏMİZ - Yə'ni tərəfinin hər ikisin əvvəlki məhkəmələrdə soyandan sonra təmiz olmaq üçün otura.

E'LANI-XATİMƏ - Bu bir e'landır ki, bunu müddəi eylər ki, mən axıra yetişdim.

Məcles təmam gəşt-o beaxer rəsid pul.
Ma həmçinan dər əvvəle kare to mandeim.

*İmza: Sırtıx*



**YUMŞAQ - QURU**

Mən qərib adam, pulum da yoxdu, gedirəm çörək almağa, səngəkçi qabaqca soruşur: yumşaq istəyirsən, quru? Deyirəm quru, görürəm şatır səngəki səliqə ilə bişirir, o tərəfini, bu tərəfini qızardır, tutur qabağıma ki götür apar. Mən də olan qalan bir abbasımı verirəm, çörəyi dürməkləyirəm və bir dəqiqədə qovurqa kimi yeyirəm genə ac qalıram.

Sabah genə getdim bir səngək istədim, genə çörəkçi soruşdu: yumşaq istəyirsən, quru? Dedim qoy bu səfər yumşaq deyim, bəlkə bu səfər qarnım doya. Dedim yumşaq. Onda gördüm zalım oğlu şatır bir xəmir kündəsini yaydı, bir təhər burşaladı (məsələn itə yal bişirən kimi), qoydu tərəziyə və bir iki tikə də kəsdi, düzəltdi verdi apardım yedim, doydum. Bəli, doydum, yə'ni möhkəm doydum, amma qarnım şişdi və sancı elədi. Getdim davaxanaya, dava soruşdum. Elə qiymət dedi ki, quruyub qaldım (amma davaxananın adını yadımda sax-lamışam ha).

İndi, ay müsəlman qardaşlar, sizdən ikicə şey soruşacağam: biri budur ki, bilmirəm bu şəhərin sahibi var, ya yox?

Biri də budur ki, səngəkçi sizdən soruşur: quru verim, ya yumşaq verim, onda siz nə cavab verirsiz və mən nə cavab verim.

Amma dərdi-sər oldu, bağışla.

*Qızdırmalı*

**SƏ'DİDƏN**

*Hər dəm əz ömr mirəvəd nəfəsi*
*Çon negəh mikonəm nəmanəd bəsi.*

Bunun təfsiri belədir ki, Sə'di əleyhirrəhmə zamanında bir gün Şirazın malikləri və dövlətliləri əbalarının qollarını geyib cəm oldular əyalətə və şikayət elədilər ki, məmləkətin qorxusu çoxdur, bir tərəfdən sərhədə cəm olub İrana hücum eləməyə hazırlaşırlar, bir tərəfdən də İsmayıl ağa və Kürdüstan qailəsilə İranın şəhərlərini dağıdır, talayır. Bizim əyalətdən iltimasımız budur ki, kafi qədər də qoşun təşkil verilsin ki, bəlkə biz əmndə yaşayaq və çün hərdəm ömrümüzdən bir nəfəs çəkdikcə görürük ki, dəxi ömrümüzün çoxu gedib azı qalıb, bizdən sonrakıların da canı cəhənnəmə.



Əyalət həmin maliklərə və milyonçu tacirlərə belə cavab verdi:

*Ey ke, pəncah rəfte dərxabi*
*Məgər in pənc ruz dəryabi.*

Yə'ni, ey əlli ili yuxuda keçirdən ağalar, ayılın xabi-qəflətdən. O ki, buyururzus kafi qədər də qüvvə hazır edək, biz dövlət xəzinəsində olan pulu müzayiqə eləmirik, amma xəzinədə o qədər pul yoxdu ki, bu qədər düşmənin qabağına qüvvə hazır edək. Siz ki, əmndə olmağı axtarırsız, tökün çölə ambarlarda saxladığuvuz qəllələri, çıxardun çölə, qorxudan yer altında gizlədiyüvüz pulları heç olmasa muftə vermiyün,

barı maliyatuvuzun baqisinə hesab edin ta ki davaya gedən qoşunlar analarını indiki kimi ac qoyub getməsinlər və dağlarda məşəqqətlərə düçar olanda sizləri nifrət ilə yada salmasınlar.



Bə'zi maliklər və dövlətməndlər əyalətə cavab verdilər ki: Mayeye-eyşədəmi-şekəm əst. Biz bu əlli il ömrümüzdə eyşü işrətə adətkərdə olmuşuq, o ki düşmən qabağına gedən və bizi əmndə saxlayan qoşunlardır, onların hamısı gəda-güdadır ki, uşaqlıqdan aclığa adət eləyənlərdir, nə eybi var ki, beş gün də davada qənaət ilə keçinsinlər, o ki, qaldı bizim ambardakı buğdamız və yer altındakı qızıl və gümüşlərimiz, onları da indi çıxartmaq məsləhət deyil, çünki təqvimdə yazılıb ki, baharda buğda və qızıl bahalanacaq.

Hökumətin axır cavabı bu oldu:

*Lacərəm mərde-aqil-o-kamel*
*Nə nəhəd bər həyate-dünya del.*

Yəni, ey ağayan, maliklər və dövlətməndlər, hər ke, aməd imarəte-no saxt. Amma birdən baxıb görəcəksiz ki, dünya elə dəyişildi ki, nə gizlənən buğdalar sizə qaldı, nə də qızıllar sizə qismət oldu, pənde-Sədi beguşe-can beşeno, yəni huşyar olun, ehtiyatlı olun və elə bilmiyin ki, dünya belə keçəcək.

*İmza: Hərdəmxəyal*



**BƏ'Zİ ƏDLİYYƏ VÜKƏLASININ TƏRƏFİNDƏN İXTAR**

O adamları ki, ədliyyənin qapanmasından sevinəcəkdilər bilsinlə, anlasınla və qansunla bizim halımıza heç təfavüt eləməz, əgər ədliyyə ola varux, olmaya varux, əzası səhih ola varux, xain ola varux, biz hamımız bir, kampaniyayux, əgər bir şarlatan istədi birinin haqqın apara, birimiz ona vəkil ollux, tərəfi-məzlum gördü ki, nahaqqın vəkili flan (...) dır, o da labüddən münasibətlə öz yoldaşlarımızın birini vəkil edər (bu xəyal ilə ki, qurdun öhtəsindən qurd gəli) onda kef bizimdur, kölgə köpəgin (pullar, lirələr, çalmax, çağırmax, zəli kimi sorrux) bir müddət bədayətdə, bəd bir zaman istinafda, elə ki, həriflər dünya malından təmizləndi və biz də yoruldux, ondan sora təmiz.



Ey ədliyyənin bağlamaqlığından sevinəcək olanlar, nə qədər biz varux ədliyyə bələdi, molla evi şələdi, hər yerdə aş olsa biz orada başux, həmişə şəriki-düzd və əyri və rəfiqi-qafiləyux, biz öz başəraflığımıza and içmişux, madam ki, biz varux qoymıyax bir düz ədalətxana icad və ehqaqi-həqq olsun, istər sanduqülmülklər gedə və yoxdanüddövlələr gələ bizə birdur. Kişi odur, bizim öhtəmizdən gəlsin.

*İmza: Keyfi dınqıldayan*
*vəkil Həmişəbahar*

**E'LAN**

Keçən nömrədə maarifxahana verdiyimiz böyük bəşarət qəlbləri gül kimi şükufətə edib ama Azərbaycanda min iki yüz mədrəsənin təşkili üçün bir məhəlli sabit tə'yin və tə'min etməmişdir və lazımdır ki, bu böyük bəşarəti də gələn nömrədə vətənxahanə e'lam edəsiz ki, Əfşar Sainqalada oğranmış zərniğ mədəni tapılıb. Onun çox-çox aidatını da Təbrizin mədarisinə təxsis veriblər.

Müdir və sərmühərrir: Cəlil Məmmədquluzadə

*Vəkillərimiz:*
*Təbrizdə – Dəmehərəmxane,*
*"Hüseyni" mətbəəsi.*
*Dəme məqbərə, tovziye cərayed.*
*Daş mağazalarda Qulu xan dərzi.*

*Təbriz, mətbəeye "Ümid".*




*Allah şahiddir ki, şəhərimizin bu dərəcədə təmizliyi həmin bələdiyyə ağalarının səy və təlaşının bərəkətindəndir.*